AZƏRBAYCAN RESPUBLİKASI
SƏHİYYƏ NAZİRLİYİ

AZƏRBAYCAN TİBB UNİVERSİTETİ




# CƏRRAHİYYƏ ÜZRƏ KLİNİK VƏ PRAKTİKİ SƏRİŞTƏLƏR

## DƏRS VƏSAİTİ

BAKI – 2017

**AZƏRBAYCAN RESPUBLİKASI SƏHİYYƏ NAZİRLİYİ**

**AZƏRBAYCAN TİBB UNİVERSİTETİ**

# CƏRRAHİYYƏ ÜZRƏ KLİNİK VƏ PRAKTİKİ SƏRİŞTƏLƏR

**DƏRS VƏSAİTİ**

**BAKI - 2017**

# CƏRRAHİYYƏ ÜZRƏ KLİNİK VƏ PRAKTİKİ SƏRİŞTƏLƏR

## DƏRS VƏSAİTİ

*Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin*
*21.11.2016-cı il tarixli 63 saylı kollegiyasının*
*qərarı ilə təsdiq edilmişdir.*

***Rəy verənlər:***

1. **Ağayev E.K.** – Azərbaycan Tibb Universitetinin Ümumi Cərrahiyyə kafedrasının müdiri, professor, t.e.d.
2. **İsayev H. B.** – Akademik M.A. Topçubaşov adına Elmi Cərrahiyyə Mərkəzinin elmi işlər üzrə direktor müavini, professor, t.e.d.

Müasir həkimlərin tibbi fəaliyyətində, gündəlik həkimlik fəaliyyətində klinik-diaqnostik vərdişlərə və səriştələrə mükəmməl yiyələnmə tələb olunur. Əksər praktik vərdişlər və səriştələr həkimlik fəaliyyəti boyunca formalaşsa da onların təməli, bazası ali tibbi təhsili və ixtisasartırma kurslarında qoyulur.

Tibb Universitetinin müalicə işi fakültəsinin yuxarı kurs tələbələri üçün nəzərdə tutulmuş bu vəsaitdə praktik vərdişlər və səriştələrin son təsnifatı, onların öyrənilməsi və mənimsənilməsi prinsipləri geniş şərh olunmuşdur. Kitabdan cərrahiyyə fənnini tədris edən müəllimlər və digər tibb ixtisasları üzrə həkimlər də istifadə edə bilər.

***Tərtib edənlər***

Azərbaycan Tibb Universitetinin I Cərrahi Xəstəliklər kafedrasının əməkdaşları:



**Bayramov N.Y., AMEA-nın müxbir üzvü, professor**



**Zeynalov B.M., dosent, t.ü.f.d.**



**Hüseynova M.R., rezident**

# GİRİŞ

Bu kitabda tələbələrin və rezidentlərin cərrahiyyə üzrə təhsil müddətində yiyələnmələri gərəkən səriştələr (bilik və bacarıqlar), xüsusən də, xəstə aparma səriştələrinin dərəcələri və səviyyələri barədə məlumat verilmişdir.

***Tibbi təhsilin prinsipləri***

Müasir tibb təhsili 4 prinsip üzərində qurulur:

- Pilləli təhsil
- Səriştəyönlü təhsil
- Səviyyəyönlü təhsil
- Faziləsiz təhsil

***Təhsil pillələri***

Təhsil pilləsi dedikdə, bilik və bacarıqların konkret səviyyəsinin mənimsənilməsi nəzərdə tutlur. Tibbi təhsilə ümumiyyətlə baxıldıqda aşağıdakı **pillələr**i görmək olar:

- Əhalinin tibbi maarifləndirilməsi
- Tibb bacılığı təhsili
- Tələbə təhsili
- Rezident təhsili
- Yan ixtisaslaşma təhsili
- Fasiləsiz tibbi təhsil (mütəxəssis təhsili)

***Səriştə və səriştəlilik prinsipi***

**Səriştə** – hər hansı əqli və ya texniki işi mükəmməl həyata keçirməyə imkan yaradan bilik və bacarığın cəmidir. Başqa sözlə, elmi biliklərə əsaslanan bacarığa səriştə deyilir. **Bilik** hər hansı mövzunu tam anlamağa və ya işi mükəmməl həyata keçirməyə imkan yaradan və doğruluğu obyektiv üsullarla isbat olunmuş məlumatlardır. **Bacarıq** isə hər hansı işi icra etmə qabiliyyətidir. **Səriştəyönlü təhsil** tələbələrə təkcə bilik yox, elmi biliklərlə əsaslandırılmış əqli və texniki bacarıqları öyrətməyi hədəf tutur.

Həkimlər peşə hazırlığı prosesində aşağıdakı 7 səriştəyə yiyələnməlidir:

- Xəstə aparma
- Ünsiyyət qurma
- Əməkdaşlıq qurma
- İdarəçilik
- Elmi-tədqiqatçı

- Öyrədici – pedaqoq
- Etik davranma

**Fasiləsiz tibbi təhsil** dedikdə tibb işçisinin daimi olaraq bilik və bacarıqlarını yeniləmək və müasir səviyyədə qoruyub saxlamaq nəzərdə tutulur. Bunun üçün tibb bacıları, tələbələr, rezidentlər, xüsusən də mütəxəssis həkimlər daimi olaraq tibbi ədəbiyyatları mütaliə etmələri, təlim kurslarında, konfranslarda, sorğularda, imtahanlarda və digər elmi-praktik tədbirlərdə iştirak etməlidir.
**Səviyyəyönlü** təhsil fənnin təməl və irəli mövzularına uyğun səriştə dərəcələrini öyrətməyi nəzərdə tutur.

***Xəstə aparma səriştələri***
Həkimin peşə təhsili müddətində əldə etməsi nəzərdə tutulan 7 mühüm səriştələr arasında xəstə aparma (xəstəni idarə etmə) səriştəsi ilk sırada durur. Xəstə aparma dedikdə xəstənin sağalmasına, ömrünün uzadılmasına və ya həyat keyfiyyətinin yaxşılaşdırılmasına kömək etmək məqsədi ilə həyata keçirilən tədbirlər kompleksi (elmi əsaslandırılmış klinik və praktik bacarıqlar) nəzərdə tutulur: həkimə müraciət, ilk yardım, qulluq, profilaktika, diaqnostika, müalicə, proqnoz, reabilitasiya, müşahidə.
Bu tədbirləri-səriştələri müxtəlif aspektlərə görə təsnif etmək olar ki, bunlara xarakterə, dərəcələrə, pillələrə və səviyyələrə görə təsnifatları aid etmək olar.
İşin **xarakterinə** görə, səriştələri 2 qrupda cəmləşdirmək olar:

- **Klinik səriştələr -** qərarvermə xarakterli əqli səriştələrdir. Bunlara xəstəliyin diaqnostikasını, müalicəsini, profilkatikasını və proqnozlaşdırmasını aid etmək olar.
- **Praktik səriştələr** – əməli (texniki) səritələrdir, bunlara müdaxilə və əməliyyatları aid etmək olar.

**Diaqnostik səriştə** – xəstəliyi tanımaq (tapmaq, müəyyənləşdimək) üçün lazım olan tədbirlərin (işlərin) seçiməsi, həyata keçirilməsi və nəticələrinin qiymətləndirməsidir.
**Müalicə səriştəsi** – xəstənin sağalmasına, ömrünün uzadılmasına və ya həyat keyfiyyətinin yaxşılaşdırılmasına kömək etmək üçün lazım olan tədbirlərin seçilməsi, həyata keçirilməsi və nəticələrinin qiymətləndirlməsidirdir.
**Profilkatika səriştəsi** – xəstəliyin qarşısını almaq üçün lazım olan tədbirlərin seçilməsi, tətbiq edilməsi və nəticələrinin qiymətləndirilməsidir.
**Proqnozlaşdırma səriştəsi** – xəstəliyin gedişini və nəticələrini təxmin etmək üçün lazım olan tədbirlərin seçilməsi, həyata keçirilməsi və nəticələrinin qiymətləndirlməsidirdir.

Praktiki təcrübədə hər bir  təhsil və ya vəzifə pilləsi üçün nəzərdə tutulan əsas işi - klink və texniki səriştələri aşağıdakı kimi göstərmək olar:

***Səriştə dərəcələri***

**Səriştə dərəcələri** dedikdə səriştəni öyrənmə mərhələləri nəzərdə tutulur və səriştənin hansı dərəcədə mənimsənildiyini göstərir. Tibbi praktikada hər hansı səriştənin 4 klassik dərəcəsi  ayrıd edilir (Şəkil 1):

- birinci dərəcə (İ) – işin nə üçün, necə edildiyini və nəticələrini bilir (əsaslandırma və ya izah etmə dərəcəsi)
- ikinci dərəcə (G) – işin necə edildiyini eksperimentdə, maktedə göstərir (göstərmə dərəcəsi)
- üçüncü dərəcə (T) – işi həyata keçirmək üçün başqasına göndərir və ya  ya kömək edir (göndərmə, transfer dərəcəsi)
- dördüncü dərəcə (E) – işi həyata keçirir (etmə, gerçəkləşdimə dərəcəsi). Bunun da bir neçə alt dərəcələri var: məcburi vəziyyətlərdə potokolların və ya konsultasiyaların köməyi ilə həyata keçirmək (E1), standart vəziyyətlərdə sərbəst həyata keçirmək (E2), həm standart, həm də qeyri-standart hallarda həyata keçirmək (E3).




***Şəkil 1. Səriştələrin dərəcələri***

Bu qaydaya uyğun olaraq klinik və praktik səriştələrin dərəcələri Cədvəl 1 və 2-də verilmişdir.

*Cədvəl 1. Klinik səriştələrin dərəcələri*

| Dərəcə | | Açıqlama |
|---|---|---|
| **S1** | ***M*** | ***Müraciət***<br>Xəstəlikdən qorunmağı (ilkin profilaktikanı), şübhələnməyi və həkimə müraciəti bacarır.<br>Bu səviyyə **xəstələr və cəmiyyət** üçün nəzərdə tutulur |
| **S2** | ***Q*** | ***Qulluq və ilk yardım***<br>Xəstəlikdən qorunma və şübhələnməklə yanaşı ümumi qulluğu, ilkin yardımı və həkim göstərişlərinin həyata keçirməyi bacarır.<br>Bu səviyyə **tibb bacıları** üçün nəzərdə tutulur |
| **S3** | **İ** | **Əsaslandırma (izah etmə)**<br>Qulluq, ilkin tibbi yardım və profilaktika ilə yanaşı, xəstəliklərin diaqnostikasını, müalicəsini, profilaktika və proqnozlaşdırılmasını elmi biliklərlə əsaslandırmağı bacarır.<br>Bu səviyyə **tələbələr** üçün nəzərdə tutulur |
| **S4** | ***G*** | ***Göstərmə***<br>Əvvəlki bacarıqlara əlavə olaraq xəstəliklərin diaqnozunu virtual xəstədə sərbəst, real xəstədə isə dəstəklə dəqiqləşdirmək.<br>Bu səviyyə əsasən **tələbələr** üçün nəzərdə tutulur və təməl patologiyalara aiddir. |
| **S5** | ***T*** | ***Şübhələnmə və göndərmə***<br>Əvvəlki bacarıqlara əlavə olaraq xəstəlikdən şübhələndikdə və ya diaqnozu dəqiqləşdirdikdə mütəxəssisə göndərmək.<br>Bu səviyyə **sahə həkimləri və fərqli ixtisas həkimləri** üçün nəzərdə tutulur. |
| **S6** | ***E1*** | ***İstisna hallarda gerçəkləşdirmə***<br>Təcili və məcburi vəziyyətlərdə xəstəliyin diaqnozunu sərbəst və ya dəstəklə dəqiqləşdirir və müalicəni icra edir.<br>Bu səviyyə **yaxın ixtisas həkimləri** üçün nəzərdə tutulur. |
| **S7** | ***E2*** | ***Standart hallarda gerçəkləşdirmə*** |

| | | |
|---|---|---|
| | | Standart vəziyyətlərdə xəstəliyin diaqnozunu dəqiqləşdirməyi, müalicə etməyi, profilaktikanı və proqnozu bacarır.<br>Bu səviyyə **rezidentlər** üçün nəzərdə tutulur |
| **S8** | ***E3*** | ***İstənilən halda gerçəkləşdirmə***<br>İstənilən vəziyyətlərdə xəstəliyin diaqnozunu dəqiqləşdirməyi, müalicə etməyi, profilaktikanı və proqnozunu təyin etməyi bacarır.<br>Bu səviyyə **təcrübəli mütəxəssislər, bölüm rəhbərləri** üçün nəzərdə tutulur. |

***Cədvəl 2. Praktik səriştələrin dərəcələri***

| | | |
|---|---|---|
| A | İ | Əsaslandırır (izah edə bilir) – nə üçün və necə edilməsini bilir |
| B | G | Göstərir – simulyatorda sərbəst və ya xəstədə mütəxəssisin dəstəyi ilə həyata keçirir |
| C | T | Mütəxəssisə göndərir və ya dəvət edir və ya kömək edir. |
| D | E1 | İstisna hallarda (təcili və məcburi vəziyyətlər) rəhbərliyə və protokollara əsaslanaraq həyata keçirir |
| E | E2 | Standart vəziyyətlərdə sərbəst həyata keçirir. |
| F | E3 | İstənilən vəziyyətdə sərbəst həyata keçirir. |

***Səriştə səviyyələri***

**Səriştələrin səviyyəsi** dedikdə hər təhsil pilləsində hansı səriştənin hansı dərəcədə mənimsənilməsi nəzərdə tutulur. Səriştə səviyyəsini müəyyən edən amil isə, xəstəliklərin və müdaxilələrin xarakteri və ağırlıq dərəcəsidir. Müasir tibbi təhsilin səviyyəlilik prinsipinə əsaslanaraq xəstəliklər və müdaxilələr xarakterinə və ağırlıq dərəcəsinə görə təməl və irəli qruplara ayrılır:

- **Təməl cərrahi xəstəliklər və ya müdaxilələr -** əsasən təcili, təxirəsalınmaz və çox rast gəlinən standart xəstəliklər və ya müdaxilələri əhatə edir.
- **İrəli cərrahi xəstəliklər və ya müdaxilələr -** az rast gəlinən, mürəkkəb və atipik xəstəlikləri və müdaxilələri əhatə edir.

Bu bölgüyə əsaslanaraq təhsilin hər bir pilləsi üçün təməl və irəli işlərdəki (xəstəliklərdə və müdaxilələrdə) klinik və praktik sərştələrin dərəcələri müəyyənləşdirilir və bu kompleks səriştə səviyyəsi adlandırılır:

**Təməl səviyyə – t**əhsil pilləsində cərrahiyyənin təməl xəstəlikləri və müdaxilələri üçün nəzərdə tutulmuş klinik (diaqnostika, müalicə, profilaktika, proqnozlaşdırma) və praktik səriştələrin minimum səviyyəsidir. Məsələn, təməl cərrahi patologiyalarda tələbələr üçün nəzərdə tutulan səviyyə diaqnostikanı göstərmək, müalicə, profilaktika və proqnozlaşdırmanı izah etməkdir. Rezidentlər üçün isə həyata keçirmək və şübhələnəndə başqa mütəxəssisə göndərməkdir.

**İrəli səviyyə – t**əhsil pilləsində cərrahiyyənin irəli dərəcəli xəstəlikləri və müdaxilələri üçün nəzərdə tutulmuş klinik (diaqnostika, muülicə, profilaktika, proqnozlaşdırma) və praktik səriştələrin minimum səviyyəsidir. Məsələn, irəli cərrahi xəstəliklərdə tələbələr üçün nəzərdə tutulan səviyyə diaqnostikanı, müalicəni, profilaktika və proqnozlaşdırmanı izah etməkdir, rezidentlər üçün isə göndərməkdir.

Bu prinsiplərə əsaslanaraq təhsil pillələri üçün nəzərdə tutulan təməl səviyyəni aşağıdakı kimi ifadə etmək olar:

- Xəstə - həkimə müraciət və xəstəlikdən qorunma
- Tibb bacısı – qulluq və ilk yardım
- Tələbə - əsaslandırma və diaqnostikanı göstərmə
- Rezident - göndərmə və ya etmə (gerçəkləşdirmə)
- Mütəxəssis həkim – gerçəkləşdirmə.

***Ümumi cərrahiyyə ixtisası üzrə rezidentlərin səriştələri***

Cərrahiyyə ixtisası üzrə təhsilin məqsədi cərrahi xəstəliklərin aparılmasını (əməliyyatönü, əməliyyatdaxili və əməliyyatdan sonrakı idarə edilməsini) öyrətməkdir. Ümumi cərrahiyyə ixtisas sahəsi qarın divarının, qida borusunun, mədənin, nazik və yoğun bağırsaqların, çanaq dibinin, qaraciyərin, öd yollarının, mədəaltı vəzin, dalağın, qalxanvari və qalxanvari ətraf vəzilərinin, böyrəküstü vəzin, döş qəfəsi divarı və orqanların (ürək və aorta istisna olmaqla), damarların (beyin damarları istisna olmaqla), dəri və darialtı toxumaların hər növ cərrahi xəstəliklərinin və travmalarının, o cümlədən transplantasiya olunmuş xəstələrinin əməliyyatönü, əməliyyatdaxili və əməliyyatdan sonrakı aparılmasını əhatə edir.

- Əməliyyatönü aparma – cərrahi xəstəliyin diaqnozunun dəqiqləşdirilməsi, yanaşı xəstəliklərin diaqnostikası, cərrahi riskin təyini  və əməliyyatönü hazırlığı
- Əməliyyatdaxili aparma – anesteziya, əməliyyatın icra edilməsi, monitorizasiya.

- Əməliyyatdan sonrakı aparma – monitorizasiya, müalicələr, ağırlaşmaların profilkatikası, diaqnostikası və müalicəsi, müşahidə, reabilitasiya.

Bunlara əsaslanaraq, ümumi cərrahiyyə rezidentinin fəaliyyət sahələri 3 qrupa ayrılır:

- **əsas ixtisas sahəsi**
- **yan ixtisas sahələri**
- **digər cərrahi sahələr**

**Əsas ixtisas sahəsinə** daxil olan xəstəliklərin və əməliyyatların əksəriyyəti ümumi cərrahiyyə rezidentinin təməl səviyyəsinə, az qismini isə irəli səviyyəsinə aid olan səriştələri əhatə edir. Yəni, ümumi cərrahiyyə rezidenti bu sahəyə daxil olan orqanların əksər təcili, təxirəsalınmaz və çox rast gələnən cərrahi xəstəliklərini təkbaşına və ya briqada üzvü kimi sərbəst aparmalı və cərrahi müdaxilələrini sərbəst şəkildə həyata keçirməlidir ***(“standart hallarda diaqnozu, müalicəni, profilaktikanı, proqnozu və əməliyyatı gerçəkləşdirmə” səviyyəsi***). Bu sahənin irəli səviyyəli səriştələri isə adətən təcrübə və kurslarla qazanılır (fasiləsiz təhsil). Ümumi cərrahın **əsas ixtisas sahəsinə** aşağıdakılar aiddir:

- Ümumi hissə
  - » Cərrahi reanimasiya və intensiv terapiya
  - » Cərrahi infeksiyalar və sepsis
  - » Qidalama və metabolizm
  - » Anesteziya
  - » Yara
  - » Hemopoetik sistem, tromboz, qanaxmalar
  - » İmmun sistemi
  - » Heriatriya
  - » Diaqnostik və müdaxiləli radiologiya
- Xüsusi hissə
  - » Qarın və həzm sistemi cərrahiyyəsi
  - » Endoskopiya
  - » Endokrin cərrahiyyə
  - » Cərrahi onkologiya
  - » Travmalar
  - » Süd vəzi cərrahiyyəsi
  - » Yumşaq toxuma cərrahiyyəsi

**Yan ixtisas sahəsi** ümumi cərrahiyyə rezidenti və mütəxəssisi üçün irəli səviyyə hesab edilən səriştələr çərçivəsindəki xəstəlikləri və əməliyyatları əhatə edir. Rezidentlər təhsil dövründə bu sahələrdə təcili vəziyyətlər istisna olmaqla ***"diaqnoz qoy, ilkin yardımı göstər və göndər"*** səviyyəsində səriştə qazanır, təməl səviyyədə səriştə əldə etmək üçün isə əlavə təkmilləşmə kursu keçməlidir. Ümumi cərrahın **yan ixtisas sahələri aşağıdakılardır:**

- Transplantologiya
- Torakal cərrahiyyə
- Vaskulyar cərrahiyyə
- Bariatrik cərrahiyyə

**Yaxın ixtisas sahəsinə** daxil olan xəstəliklərin və əməliyyatların əksəriyyəti ümumi cərrahiyyə rezidenti üçün irəli səviyyə, az qismi isə təməl səviyyə hesab edilir. Bu sahə digər orqanların təcili, çox rastlanan və differensiasiya gərəktirən xəstəliklərini və ortaq müdaxilələri əhatə edir. Ümumi cərrah bu sahələr üzrə birincili məsul deyil, səriştəsi isə ***"diaqnoz qoy, ilkin yardımı göstər və göndər"*** səviyyəsindədir**,** lakin istisna hallar kimi təcili və məcburi vəziyyətlərdə bəzi xəstələri apara bilər. Ümumi cərrahın **yaxın ixtisas sahələrinə aşağıdakılar aid edilir:**

- Ginekologiya
- Urologiya
- Plastik-rekonstruktiv cərrahiyyə
- Neyrocərrahiyyə
- Ürək cərrahiyyəsi
- Travmatologiya və ortopediya
- Pediatrik cərrahiyyə

***Tələbələr üçün cərrahi səriştələr***

Tələbələrə cərrahiyyə üzrə tədrisin məqsədi xəstə aparılmasına hazılıq mərhələsini, xüsusən də diaqnostik və sadə praktik səriştələrin göstərmə dərəcəsini öyrətməkdir.

Tələbələrin müasir cərrahiyyə təhsilinin əsasında da səriştəyönlü və səviyyəyönlü təhsil durur.

Tələbələr üçün **təməl səviyyə klinik səriştələr** dedikdə təməl cərrahi patologiyalarda (təcili, təxirəsaslınmaz və ən çox rast gəlinən cərrahi xəstəliklər) diaqnostikanı göstərmə, müalicə, profilaktika və proqnozlaşdırılmasını isə izah etmə bacarığı nəzərdə tutulur. Tələbələr bu səriştələrə təhsil dövründə auditoriyalarda və klinikalarda yiyələnirlər. **Təməl səviyyə praktik səriştələrə** xəstələrdə ən çox yerinə yetirililən

prosedураları simulyatorda və ya real xəstədə göstərmə bacarığı aiddir. Tələbələr bu səriştələrə təlim kurslarında, laboratoriyalarda, istehsalat təcrübəsində və klinikalarda yiyələnirlər. Qeyd etmək lazımdır ki, tələbələrin xəstə aparma məsuliyyəti olmadığı üçün, onlar bu səriştələri xəstələrdə  həkimin iştirakı və xəstənin razılığı  ilə göstərə bilərlər.
Tələbələrin **irəli səviyyə** patologiyalarda klinik səriştəsi diaqnostikanı, müalicəni, profilaktika və proqnozlaşdırmanı izah etməkdən - elmi əsaslandırmaqdan ibarətdir. Tələbələr bu səriştələri adətən sərbəst şəkildə öyrənərək əldə edirlər. Az rast gəlinən patologiyalar tələbələr üçün irəli səviyyə sayılır.
Cərrahi əməliyyatlar tələbələr üçün irəli səviyyə sayılır və bu müdaxilələr üçün tələbənin vəzifəsi əməliyyatı izah etməkdən ibarətdir – göstərişləri, əks-göstərişləri, texnikasını ümumi şəkildə izah etmək.
Beləliklə, tələbələr üçün ümumi cərrahiyyə üzrə təhsilin hədəfi cərrahiyyənin nəzəri əsaslarını öyrənmək,  təməl səviyyəyə aid cərrahi patologiyaların  diaqnostikasını və müdaxilələri göstərmək səriştəsinə, irəli səviyyə patologiyaların və müdaxilələrin isə elmi əsaslarını izah etmək səriştəsinə yiyələnməkdir.  Tələbələr həmçinin bəzi təməl təlim kurslarını da keçməlidirlər.

***Qısaltmalar:***

1. T – tələbə
2. S/H – sahə həkimi
3. U/G – urologiya, ginekologiya və digər ixtisas rezidentləri
4. R – rezidentlər
5. M – mütəxəssis

# CƏRRAHİYYƏ ÜZRƏ KLİNİK VƏ PRAKTİKİ SƏRİŞTƏLƏR

## ÜMUMİ HİSSƏ

| | T | S/H | U/G | R | M |
|---|---|---|---|---|---|

### CƏRRAHİ ƏMƏLİYYATIN MƏQSƏDLƏRİ

**Biliklər**

Cərrahi əməliyyatın tərifi və növləri
Diaqnostik
Müalicə
Toxumanı çıxarma
Mayeni çıxarma
Mənfəzi açma
Toxuma bərpası
Rekonstruksiya

**Bacarıqlar**

Cərrahi əməliyyatın məqsədlərini klinik nümunələr əsasında izah etmək, göstərmək, və ya həyata keçirmək

### CƏRRAHİ ƏMƏLİYYATIN ORQANİZMƏ TƏSİRİ

**Biliklər**

Yerli dəyişiklik - yara, qanaxma, ağrı
Ümumi dəyişiklik - stress, SİRS, endokrin-metabolik, su-duz, tənəffüs, qan dövranı, beyin, mədə-bağırsaq, qaraciyər, böyrək, hərəkət hemopoetik və s.
Əməliyyatdan sonrakı gedişə təsir edən amillər

**Bacarıqlar**

Cərrahi əməliyyatın törətdiyi yerli və ümumi dəyişikliklərin mexnizmlərini izah etmək, diaqnostikasını, müalicəsini, profilaktika və proqnozlaşdırlımasını izah etmək, göstərmək və həyata keçirmək

### CƏRRAHİ PATOLOGİYALAR

**Biliklər**

**Hüceyrə zədələnməsi -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, profilaktikası, proqnozu

**Anadangəlmə xəstəliklər -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, diaqnostikası, müalicə prinsipləri, profilaktikası, proqnozu

**Travma -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**İltihab - t**ərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Cərrahi infeksiyalar -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Neoplaziya -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Kist -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Degenerativ xəstəliklər -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Xora -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Vaskulyar (tomboz, işemiya, nekroz) -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Qanaxma -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Endokrin-metabolik -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Autoimmun -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Disfunksional -** tərifi, təsnifatı, səbəbləri, mexanizmləri, müayinə üsulları, diaqnostikası, müalicə prinsipləri, cərrahi müalicəyə göstərişlər, profilaktikası, proqnozu

**Bacarıqlar**

Cərrahi patologiyaların diaqnostikasını, müalicəsini, profilaktika və proqnozunu nümunələr üzərində izah etmək, göstərmək və ya həyata keçirmək

## YARA SAĞALMASI

**Biliklər**

Yaraların səbələri və növləri

Yara sağalmasının mexanizmləri

Yara sağalmasına təsir edən fizioloji və patoloji amillər

Yaraların diaqnostikasının və müalicəsinin prinsipləri və üsulları

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Açıq yaraların müalicəsi | **İ** | **T** | **E1** | **E2** | **E3** |
| Xroniki yaralar | **İ** | **T** | **E1** | **E2** | **E3** |
| Yataq yarası | **İ** | **T** | **E1** | **E2** | **E3** |
| İşemik arterial xoralar | **İ** | **T** | **E1** | **E2** | **E3** |
| Venoz staz xoraları | **İ** | **T** | **E1** | **E2** | **E3** |
| Çapıq və kontrakturalar | **İ** | **T** | **E1** | **E2** | **E3** |

**Praktik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Yara tikilməsi və ağırlaşmaların profilaktikası | **G** | **E1** | **E2** | **E3** | **E3** |
| Yara sarğıları | **G** | **E1** | **E2** | **E3** | **E3** |

## CƏRRAHİ İNFEKSİYA

**Biliklər**

İnfeksiyaya cavab reaksiyası, SİRS və sepsis
Cərrahi infeksiyaların klassifikasiyası
Mikrobiomlar, ekzogen və endogen infeksiyalar
Antibakterial maddələr
Cərrahi infeksiyaların diaqnostika və müalicəsinin prinsipləri və metodları

**Klinik və parktik Bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Hospital infeksiyaları | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| İnfeksiyon kontrol mərkəzi | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Hospital gigiyenası | **İ** | **E2** | **E2** | **E2** | **E3** |
| Sterlizasiya | **G** | **E2** | **E2** | **E2** | **E3** |
| Aseptika və antiseptika | **G** | **E2** | **E2** | **E2** | **E3** |
| Bakterial infeksiyalar | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Viral infeksiyalar | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Fungal infeksiyalar | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Antibiotikoprofilaktika və antibiotikoterapiya | **İ** | **E2** | **E2** | **E2** | **E3** |
| İnfeksiyon ağırlaşmalar: cərrahi sahə infeksiyaları, uzaq infeksiyalar | **İ** | **T** | **E2** | **E2** | **E3** |

## ANESTEZİYA

**Biliklər**

Ağrının patofiziologiyası

Anesteziyanın prinsipləri və metodları

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Xəstənin anestezioloji qiymətləndirilməsi | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Preoperativ hazırlıq | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Anesteziya üsulunun seçimi | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| Anestezioloji ağırlaşmalar | **İ** | **T** | **E2** | **E2** | **E3** |

**Praktik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Yerli və regional anesetziya | **İ** | **G** | **E1-E2** | **E1-E2** | **E3** |
| Ümumi anesteziya | **İ** | **G** | **E1-E2** | **E1-E2** | **E3** |
| Əməliyyat zamanı monitorizasiya | **İ** | **G** | **E1-E2** | **E1-E2** | **E3** |
| İntubasiya və ekstubasiya | **İ** | **G** | **E1-E2** | **E1-E2** | **E3** |

## SU, ELEKTROLİT VƏ TURŞU-QƏLƏVİ TARAZLIĞI

**Biliklər**

Normal su-elektrolit və turşu-qələvi tarazlığı

Orqanizmin maye mühitləri

Maye mühitləri arasında su mübadiləsinin fiziologiyası və patofiziologiyası

Su-elektrolit homeostazında yaşla əlaqədar dəyişikliklər

Su-elektrolit pozulmalarının diaqnostika və müalicəsinin prinsipləri və metodları

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Elektrolit pozulmaları | **G** | **T** | **E3** | **E3** | **E3** |
| Maye pozulmaları | **G** | **E1** | **E3** | **E3** | **E3** |
| Turşu-qələvi pozulmaları | **G** | **E1** | **E3** | **E3** | **E3** |

## QİDALANMA VƏ METABOLİZM

**Biliklər**

Normada və stressdə metabolizm

Qidalanma pozulmaları

Qidalandırmanın növləri, qida vasitələri, qidalandırmaya göstərişlər və əks göstərişlər, ağırlaşmaları və s.

**Klinik bacarıqlar**

| | | | | |
|---|---|---|---|---|
| Qidalanmanın qiymətləndirilməsi | **G** | **T** | **E2** | **E3** |
| Enerji ehtiyacının hesablanması | **İ** | **T** | **E2** | **E3** |
| Parenteral qidalanma | **İ** | **T** | **E2** | **E3** |
| Enteral qidalandırma | **İ** | **T** | **E2** | **E3** |
| Xəstəliklərə spesifik qidalandırma | **İ** | **T** | **E2** | **E3** |

## HEMOPOETİK SİSTEM VƏ CƏRRAHİYYƏ

**Biliklər**

Hemopoetik sistemin anatomiyası, fiziologiyası, patologiyaları, xəsəliklərinin ağırlaşmaları, əlamətləri, müayinə üsulları, müalicə prinsipləri və üsulları

Hemopoezin mexanizmləri

Hemostazın, koaqulyasiya və fibrinolizin mexanizmləri

Hemopoetik sistemin cərrahi xəstəliklərin gedişinə və əməliyyatdan sonrakı gedişə təsiri

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Anemiyalar | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Hemoqlobinopatiya və hemolitik anemiyalar | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Polisitemiya | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Leykopeniyalar | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Trobmositopeniyalar | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Koaqulopatiyalar | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Yayğın damardaxili qanaxma | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Antikoaqulyant alan xəstələrin aparılması | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Trombofiliya | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Transfuziya reaksiyaları | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Trombozlar | **G** | **T** | **E1** | **E1** | **E3** |

**Praktik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Qan və komponentlərinin köçürülməsi | **G** | **E1** | **E2** | **E2** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| Antikoaqulyant və trombolitik müalicənin aparılması | **İ** | **G** | **E2** | **E2** | **E3** |
| Limfa düyünü çıxarılması | **İ** | **İ** | **E1** | **E2** | **E3** |
| Anemiyalarda splenektomiya və digər müalicələr | **İ** | **İ** | **E1** | **E2** | **E3** |

## İMMUN SİSTEM VƏ CƏRRAHYYƏ

**Biliklər**

İmmun sistemin komponentləri
İmmun sistemin infeksiyaya, travmaya və toxuma köçürülməsinə cavab mexanizmləri
Transplant immunologiyası
İmmunosupressiya

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| İmmunosupressiv xəstədə cərrahiyyə | **İ** | **İ** | **E1** | **E2** | **E3** |
| Autoimmun xəstələiklər və cərrahiyyə | **İ** | **İ** | **E1** | **E2** | **E3** |
| Quduzluğa qarşı immunizasiya | **İ** | **E1** | **E1** | **E2** | **E3** |
| Tetanusa qarşı immunprofilaktika və immunterapiya | **İ** | **E1** | **E1** | **E2** | **E3** |

## ONKOLOGİYA VƏ ŞİŞ BİOLOGİYASI

**Biliklər**

Kanserin molekulyar biologiyası
Kanserogenz
Kanserdə genetik amillərin rolu
Metastazın mexanizmləri
Kanser epidemiologiyası
Kanserin patomorfologiyası
Kanserin diaqnostika prinsipləri
Kanserin mərhələsinin təyini prinsipləri
Kanserin müalicə prinsiplləri: cərrahi, raioterapiya, kimyaterapiya, immunoterapiya, hormon və digər müalicələr

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Kanser skriningi | **İ** | **T** | **E1** | **E2** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| Hər orqanın bəd xassəli törəmələrinin diaqnostikası və müalicəsi (bölümlərdə verilir) | | | | | |
| Kanserli xəstədə ağrının müalicəsi | **İ** | **E1** | **E1** | **E2** | **E3** |
| Terminal vəziyyətli onkoloji xəstələrə yardım | **İ** | **E1** | **E1** | **E2** | **E3** |

## ENDOSKOPİYA

**Biliklər**

Endoskopiyanın iş prinsipi və gigiyena
Endoskopiyanın növləri
Endokopik müayinə və müdaxilələrə göstərişlər, əks göstərişlər, ağılaşmalar

| **Praktik bacarıqlar** | | | | | |
|---|---|---|---|---|---|
| Ezofaqoqastroskopiya | **İ** | **İ** | **G** | **E2** | **E3** |
| Kolonoskopiya | **İ** | **İ** | **G** | **E2** | **E3** |
| Bronxoskopiya | **İ** | **İ** | **G** | **E2** | **E3** |
| Endoskopik biopsiya | **İ** | **İ** | **G** | **E2** | **E3** |
| Endoskopik lavaj | **İ** | **İ** | **G-E1** | **E2** | **E3** |
| Diaqnostik və cərrahi ERXPQ | **İ** | **İ** | **G** | **G** | **E3** |
| Polipektomiya, mukozektomiya, stentin qoyulması | **İ** | **İ** | **G** | **G** | **E3** |
| Varikoz damarların skleroterapiyası | **İ** | **İ** | **G** | **G** | **E3** |
| Qanaxmanın endoskopik yolla dayandırılması | **İ** | **İ** | **G** | **G** | **E3** |

## RADİOLOGİYA

**Biliklər**

Görüntüləmə üsullarının biofizikası və zərərləri
Şüa diaqnostikasının prinsipləri: rentgen, USM, KT, MRT,PET-KT və digər
Kontrast istifadəsinin prinsipləri
Diaqnostik və terapevtik radioloji metodlar

| **Praktik bacarıqlar** | | | | | |
|---|---|---|---|---|---|
| Rentgenlə yad cisimin təyini | **G** | **G** | **E2** | **E2** | **E3** |
| USM ilə patologiyaların təyini | **G** | **G** | **E2** | **E2** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| KT ilə patologiyanın təyini | **G** | **G** | **E2** | **E2** | **E3** |
| Radioloji diaqnostik müdaxilələr: punksiya, biopsiya | **İ** | **G** | **E2** | **E2** | **E3** |
| Radioloji terapevtik müdaxilələr: stend, kateter, ablasiya və digər | **İ** | **G** | **E2** | **E2** | **E3** |
| Radioloji mühafizə | **İ** | **E1** | **E2** | **E2** | **E3** |

## HERİATRİYA

**Biliklər**

Yaşlanmanın fizioloji və klinik effketləri

**Klinik bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Yaşlı xəstələrin müayinəsi və qiymətlənirilməsi | **İ** | **E1** | **E2** | **E2** | **E3** |
| Yaşlı xəstələrdə dərmanların dozasının ayarlanması | **İ** | **E2** | **E2** | **E2** | **E3** |
| Yaşlı xəstələrdə radikal və palliativ əməliyyatların seçimi | **İ** | **İ** | **E2** | **E2** | **E3** |

## CƏRRAHİ XƏSTƏLƏRİN APARILMASI

**Biliklər**

Cərrahi xəstələrin əməliyyatönü müayinələri, orqan və sistemlərin qiymətləndirlməsi və hazırlığı, cərrahi risqin təyini, əməliyyatdaxili aparılması, əməliyyatdan sonrakı izləmə və müalicəsi üçün lazım olan Biliklər: cərrahi əməliyyatların, cərrahi patologiyaların və yanaşı xəstəliklərin orqan və sistemlərdə törətdiyi dəyişikliklər, əməliyyatdan sonrakı ağırlaşmalar və bunların etilologiyası, patogenzi, klinikası, müayinəsi, müalicə və proqnozlaşdırılma prinsipləri.

**Klinik bacarıqlar**

***Əməliyyatönü aparma***

| | | | | | |
|---|---|---|---|---|---|
| Əməliyyatönü rutin müayinələr | **G** | **T** | **E3** | **E3** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| Tənəffüs sisteminin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Ürəyin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Qastrointestinal sistemin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **E1** | **E2** | **E3** |
| Sidik-cinsiyyət sisteminin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **T-E1** | **E1** | **E3** |
| Ətrafların dəyərləndirilməsi | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Vaskulyar sistemin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **T-E1** | **E2** | **E3** |
| Endokrin sistemin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **T-E1** | **E1** | **E3** |
| Qanyaradıcı sistemin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Psixiatrik problemlərin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **T** | **T** | **E3** |
| İmmun sisteminin preop dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **E1** | **E1** | **E3** |
| Su-elektrolit mübadiləsinin dəyərləndirilməsi və patologiyalarının korreksiyası | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Anestezioloji baxımdan dəyərləndirilmə | **G** | **T** | **T** | **T** | **E3** |
| Cərrahi riskin qiymətləndirilməsi | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Əməliyyata razılığın alınması | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Tromboz profilakstikası | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Preoperativ antibiotikoprofilaktiaka | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Premedikasiya və sedasiya | **İ** | **T** | **E2** | **E2** | **E3** |
| ***Əməliyyatdaxili aparma*** | | | | | |
| Xəstəni əməliyyata göndrəmə | **İ** | **İ** | **E2** | **E2** | **E3** |
| Aseptika və antiseptika | **İ** | **İ** | **E2** | **E2** | **E3** |
| Əməliyyat zamanı pozisiya | **İ** | **İ** | **E2** | **E2** | **E3** |
| Yerli və ümumi anesteziyanın prinsipləri | **İ** | **İ** | **E2** | **E2** | **E3** |
| Əməliyyat zamanı sinir zədələnmələrinin və hipotermiyanın profilaktikası | **İ** | **İ** | **E2** | **E2** | **E3** |
| Əməliyyatdaxili monitorizasiya | **İ** | **İ** | **E2** | **E2** | **E3** |

***Əməliyyatdan sonrakı aparma***

| | | | | | |
|---|---|---|---|---|---|
| Posoperativ monitorizasiya və gedişi qiymətləndirmə | **G** | **G** | **E2** | **E2** | **E3** |
| Rutin postoperativ müalicələr (ağrıkəsicilər, infuziya, antibiotik, trombopofilaktika, qidalandırma, drenlərə və yaraya qullluq və s) | **G** | **G** | **E2** | **E2** | **E3** |
| Postoperativ ağırlaşmalar (cərrahi sahə ağırlaşmaları, pulmonar, kardio-vaskulyar, sinir sistemi, qaraciyər, qastrointestunal, renal, endokrin, hematoloji və s) | **İ** | **İ** | **T-E2** | **E2** | **E3** |

## CƏRRAHİYYƏDƏ KRİTİK VƏZİYYƏTLƏR, İNTENSİV TERAPİYA VƏ REANİMASİYA

**Biliklər**

İntensiv terapiya və reanimasiya gərəkdirən kritik xəstəliklərin diaqnostikasını, müalicəsini, pofilkatikasını və proqnozlaşdırmasını həyata keçirmək üçün lazım olan biliklər: anatomiya, klinik fiziologiya və patoloji anatomiya, xəstəliklərin tərifi, təsnifatı, epidemiologiyası, etiologiyası, patogenezi, patomorfologiyası, gedişi və ağırlaşmaları, klinik əlamətləri, müayinələri (klinik, laborator, görüntüləmə və digər), diaqnostikası, müalicə üsulları, müalicə nəticələri, profilaktikası, proqnozlaşdırma üsulları və s.

Kritik xəstələrdə aşağıdakı müdaxilələri və cərrahi əməliyyatları aparmaq üçün lazım olan biliklər: tərifi, göstərişlər, əks göstərişlər, texnikası və işləmlərin ardıcıllığı, ağırlaşmaları və s.

**Kritik vəziyyətlər (Klinik bacarıqlar)**

| | | | | | |
|---|---|---|---|---|---|
| Kritik vəziyyətlərdəki xəstələrdə həyatqurtarma | **G** | **T** | **E2** | **E2** | **E3** |
| İntensiv terapiya şöbəsinə yatışa və çıxışa göstərişlər | **G** | **T** | **E2** | **E2** | **E3** |
| İntensiv terapiyada monitorizasiya | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Ürək dayanması | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Beyin ölümü | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Anaflaksiya | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Kəskin tənəffüs yetməzliyi, KRDS | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Ürək yetməzliyi, aritmiyalar | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Şok (hipovolemik, kardiogen septik, neyrogen) | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Nevroloji disfunksiya (koma və digər) | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Qaraciyər yetməzliyi | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Böyrək yetməzliyi | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Qastrointestinal yetməzlik | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Endokrin disfunksiya | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Su-elektrolit, turşu-qələvi pozulmaları | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Koqaluopatiya | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Sepsis | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Kəskin qarın, abdominal kompartman sindrom | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Pnevmoniya | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Tromboemboloiyalar | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Hipertermik kriz | **G** | **T** | **E2** | **E2** | **E3** |
| Çoxlu orqan yetmzəliyi | **G** | **T** | **E2** | **E2** | **E3** |
| İntensiv terapiyada nozokaomial infeksiyalar | **G** | **T** | **E2** | **E2** | **E3** |
| | | | | | |
| **Praktik bacarıqlar** | | | | | |
| İnvaziv monitorizasiya | **İ** | **G** | **E2** | **E2** | **E3** |
| Hava yollarına müdaxilələr - maskalar, intubasiya, traxeostomiya | **G** | **E1** | **E2** | **E2** | **E3** |
| Oksigenasiya | **G** | **E1** | **E2** | **E2** | **E3** |
| Mexaniki ventilyasiya | **G** | **E1** | **E2** | **E2** | **E3** |
| Arterial kateter qoyulması | **İ** | **E1** | **E1** | **E2** | **E3** |
| Pulmonar arteriya kateteri | **İ** | **G** | **G** | **E2** | **E3** |
| Mərkəzi vena kateterizasiyası | **İ** | **G** | **E1** | **E2** | **E3** |
| Komartment təzyiq ölçülməsi (abdominal, ətraf) | **İ** | **G** | **E1** | **E2** | **E3** |
| Defibrilyasiya və kardioversiya | **G** | **E1** | **E2** | **E2** | **E3** |
| Enteral qidalandırma zondunun qoyulması | **İ** | **İ** | **E1** | **E2** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| Zədələnməyə nəzarət laparotomiyası | **İ** | **İ** | **E1** | **E2** | **E3** |
| Laparostomiya qoyulması və aparılması | **İ** | **İ** | **E1** | **E2** | **E3** |
| Parasentez | **İ** | **İ** | **E2** | **E2** | **E3** |
| Plevral drenaj | **G** | **E1** | **E2** | **E2** | **E3** |
| Perikardiosentez | **İ** | **E1** | **E2** | **E2** | **E3** |
| Sidik kateteri | **G** | **E2** | **E2** | **E2** | **E3** |
| Qarın və plevra və damar USM | **İ** | **G** | **E2** | **E2** | **E3** |
| Ekstrakorporal detoksikasiyalar | **İ** | **G** | **E1** | **E2** | **E3** |
| Kardiak pacemaker | **İ** | **G** | **E1** | **E2** | **E3** |

## ÜMUMİ PRAKTİK SƏRİŞTƏLƏR VƏ TEXNOLOGİYALAR

**Biliklər**

Aşağıdakı praktik işləri izah etmək və göstərə bilmək üçün lazım olan biliklər

**Bacarıqlar**

| | | | | | |
|---|---|---|---|---|---|
| Monitorlar və monitorizasiya | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Defibrilyator | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Cərrahi alətlər və istifadə qaydaları | **İ** | **G** | **E2-E3** | **E3** | **E3** |
| Yüksək güc mənbələri və istifadə qaydaları | **İ** | **G** | **E2-E3** | **E3** | **E3** |
| Cərrahi yamaqlar, drenajlar və digər materiallar | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Tikiş materialları | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Xəstələrə qulluq (ağız, burun, qulaq, dəri, ayaq, saç, yataq, paltar, yedizrirmə, yeritmə və s) | **G** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Dərialtı ineksiya | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Əzələdaxili ineksiya | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Vena kateterizasiyası (periferik venadan) | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Mərkəzi vena kateterizasiyası (vidaci və körpüçükaltı venadan) | **İ** | **G** | **E2-E3** | **E3** | **E3** |
| Arterial kateter qoyulması | **İ** | **G** | **E2-E3** | **E3** | **E3** |
| Endotraxeal intubasiya | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Traxeostomanın qoyulması | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Sidik kisəsinin kateterizasiyası | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Sistostomiya | **G** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Nazoqastral zond | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Periton kateteri | **İ** | **G** | **E2-E3** | **E3** | **E3** |
| Plevral punksiya və drenaj | **G** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Perikardiosentez | **İ** | **G** | **E2-E3** | **E3** | **E3** |
| İmalə | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Yaraya qulluq | **G** | **E1** | **E2-E3** | **E3** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| Stomalara qulluq | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Xəstəyə poziasiya vermək | **İ** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Düyünlər | **G** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Sarğılar | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Yerli anaesteziya | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Regional asnesteziya | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Dərinin hazırlanması | **G** | **E2** | **E2-E3** | **E3** | **E3** |
| Dəri kəsikləri və tikişləri | **G** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Dəri və dərialtı törəmələrin çıxarılması | **İ** | **E1** | **E2-E3** | **E3** | **E3** |
| Bağırsaq anastomozları | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Mexaniki tikiş alətləri ilə bağırsaq anastomozlıar | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Damar, sinir, vətər anastomozları anastomozları | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Miniinvaziv üsullar | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Biopsiyanın alınması | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |
| Patoloji anatomik təhriş və müayinələr | **İ** | **İ** | **E2-E3** | **E3** | **E3** |

## XÜSUSİ HİSSƏ

## HƏZM SİSTEMİ VƏ QARIN CƏRRAHİYYƏSİ

### Qarın sindromları

**Biliklər**

Qarın boşluğu orqanlarının aşağıdakı çox rast gəlinən sindromlarının diaqnostikasını, müalicəsini, profilkatikasını və proqnozunu əsaslandırmaq üçün lazım olan elmi biliklər: cərrahi anatomiya, klinik fiziologiya və patoloji anatomiya, xəstəliklərin tərifi, təsnifatı, epidemiologiyası, etiologiyası, patogenezi, patomorfologiyası, gedişi və ağırlaşmaları, klinik əlamətləri, müayinələri (klinik, laborator, görüntüləmə və digər), diaqnostikası, müalicə üsulları, müalicə nəticələri, profilaktikası, proqnozlaşdırma üsulları və s.

**Klinik bacarıqlar**

***Təməl səviyyə***

| | | | | | |
|---|---|---|---|---|---|
| Kəskin qarın | **G** | **T** | **T** | **E2** | **E3** |
| Kəskin mədə-bağırsaq qanaxmaları | **G** | **T** | **T** | **E2** | **E3** |
| Mədə-bağırsaq keçməzliyi | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qarındaxili qanaxma | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qarında şişkinlik | **G** | **T** | **T** | **E2** | **E3** |
| Sarılıq | **G** | **T** | **T** | **E2** | **E3** |
| Cərrahi anomaliyalar | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qastrointestinal kanalın xoraları | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qastrointestinal fistullar | **G** | **T** | **T** | **E2** | **E3** |
| Xronik abdominal ağrı | **G** | **T** | **T** | **E1-E2** | **E3** |

## Qida borusu cərrahiyyəsi

**Biliklər**

Qida borusunun aşağıdakı cərrahi xəstəliklərinin diaqnostikasını, müalicəsini, profilkatikasını və proqnozunu əsaslandırmaq üçün lazım olan elmi biliklər: cərrahi anatomiya, klinik fiziologiya və patoloji anatomiya, xəstəliklərin tərifi, təsnifatı, epidemiologiyası, etiologiyası, patogenezi, patomorfologiyası, gedişi və ağırlaşmaları, klinik əlamətləri, müayinələri (klinik, laborator, görüntüləmə və digər), diaqnostikası, müalicə üsulları, müalicə nəticələri, profilaktikası, proqnozlaşdırma üsulları və s.

Qida borusunda aşağıdakı müdaxilələri və cərrahi əməliyyatları aparmaq üçün lazım olan biliklər: tərifi, göstərişlər, əks göstərişlər, texnikası və işləmlərin ardıcıllığı, ağırlaşmaları və s.

**Klinik bacarıqlar**

***Təməl səviyyə***

| | | | | | |
|---|---|---|---|---|---|
| Disfagiya | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qida borusu perforasiyası (spontan, yatrogen) | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qida borusu yad cisimləri | **G** | **T** | **T** | **E2** | **E3** |
| Mallori-Veys sindromu | **G** | **T** | **T** | **E2** | **E3** |

| | | | | | |
|---|---|---|---|---|---|
| Axalaziya | **G** | **T** | **T** | **E2** | **E3** |
| GERX | **G** | **T** | **T** | **E2** | **E3** |
| Barret ezofaqusu | **G** | **T** | **T** | **E2** | **E3** |
| Hiatal yırtıq | **G** | **T** | **T** | **E2** | **E3** |
| Divertikula (Zenker, Epifrenik) | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qida borusu strikturları | **G** | **T** | **T** | **E2** | **E3** |
| Qida borusu əməliyyatlarından sonrakı ağırlaşmalar | **İ** | **T** | **T** | **T-E2** | **E3** |
| ***İrəli səviyyə*** | | | | | |
| Qida borusu yanıqları (kimyəvi) | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Diffuz ezofaqus spazmı | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Nutkraker ezofaqus | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Qida borusu xərçəngi | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Qida borusu xoş şişləri | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Qida borusunun varikozları | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Schatzki’s ring | **İ** | **T** | **T** | **E1** | **E3** |
| Sklerodermiyaya bağlı problemlər | **İ** | **T** | **T** | **E1** | **E3** |
| **Müdaxilələr (praktiki Bacarıqlar)** | | | | | |
| ***Təməl səviyyə*** | | | | | |
| Ezafaqoskopiya | **İ** | **İ** | **İ** | **E2** | **E3** |
| Ezofageal divertikulektomiya | **İ** | **İ** | **İ** | **E2** | **E3** |
| Ezofagus perforasyası əməliyyatları | **İ** | **İ** | **İ** | **E2** | **E3** |
| Diafraqma yırtığının bərpası | **İ** | **İ** | **İ** | **E2** | **E3** |
| Antireflüks əməliyyatları (açıq və laparoskopik) | **İ** | **İ** | **İ** | **E2** | **E3** |
| ***İrəli səviyyə*** | | | | | |
| pH-metriya | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Manometriya | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Distal ezofaqektomiya | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Total ezefaqektomiya (transhiatal) | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Total ezefaqektomiya (abdomino-torako-servikal) | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Ezofageal “yanyol” əməliyyatları | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Ezofaqoqastrektomiya | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Heller miotomiyası (açıq, laparoskopik) | **İ** | **İ** | **İ** | **E1** | **E3** |
| Collis qastroplastikası | **İ** | **İ** | **İ** | **E1** | **E3** |

**Mədə və 12bb cərrahiyyəsi**

